AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 70, №2, səh. 172-174 (2015)

# Abşeron Şəraitində Jasminvari traxelospermum (*Trachelospermum jasminoides* L.) Növünün Bioekoloji Xüsusiyyətlərinin Və Vegetativ Çoxaldılmasının Öyrənilməsi

**A.D. Mehralıyev**

*AMEA Mərkəzi Nəbatat Bağı, Badamdar şossesi, 40, Bakı AZ1004, Azərbaycan*

**Məqalədə Jasminvari traxelospermum növünün Abşeronda (Mərkəzi Nəbatat Bağında) introduksiyası, bioekoloji xüsusiyyətlərinin öyrənilməsi və vegetativ yolla çoxaldılması öz əksini tapır. Növ Abşeronda ilk dəfə tədqiq olunur və tədqiqatların nəticəsində məlum olmuşdur ki, Abşeronda bu növ normal inkişaf etməklə şaquli yaşıllaşdırmada müvəffəqiyyətlə tətbiq oluna bilər.**

***Açar sözlər:*** *Vegetativ çoxaldılma, qələm, buğumarası məsafə, yarımkölgə, böyümə intensivliyi*

## GİRİŞ

Landşaft memarlığında şaquli yaşıllaşdırma elementlərindən (lianlar) istifadə, müasir dövrdə daha çox əhəmiyyət daşıyır. İri şəhərlərdə müxtəlif təyinatlı bina tikililərinin genişləndirilməsi təbii olaraq torpaq sahələrinin azalması ilə nəticələnir. Ona görə də mümkün torpaq sahələrindən daha səmərəli istifadə olunması, bitkilər becərilə bilən sahələrin şaquli istiqamətə genişləndirilməsi zərurətə çevrilir.

Abşeron florasının yeni bitki növ və formaları ilə zənginləşdirilməsi baxımından aparılan tədqiqatlar xüsusilə əhəmiyyətlidir.

Tədqiq etdiyimiz növ – *Jasminvari traxelospermum* Abşeron florası üçün ən yeni növlərdəndir. Tərəfimizdən ilk dəfə AMEA-nın Mərkəzi Nəbatat Bağına 2012-ci ildə həvəskar bağbanlar vasitəsilə İtaliyadan birillik və ikiillik qələmlər (cilik) şəklində gətirilərək əkilmiş və üzərində tədqiqat işlərinə başlanmışdır.

Jasminvari traxelospermum (*Trachelospermum jasminoides* L.) Kəndirkimilər (*Apocynaceae* Juss.) fəsiləsinə aid olub, həmişəyaşıl kol tipli sarmaşan bitkidir. Yarpaqları enli-ellipsvari, üst tərəfdən tünd, altdan isə açıq yaşıl rəngli, səthi hamar və parlaq, kənarları bütövdür. Abşeronda iyun-iyul aylarında çiçəkləyir. Çiçəklər ağ rəngli, ətirli olub, çətirvari topalarda yığılmışdır. Çiçəkləmə müddəti Abşeron şəraitində 60 günə qədərdir. İntensiv çiçəkləmə qabiliyyətinə malikdir. Çiçəklədiyi dövrdə bitki sanki ağ örtüyə bürünür (şəkil). Buna baxmayaraq, çox az meyvə əmələ gətirir. Meyvələri tək-tək və ya ikisi bir yerdə formalaşan buynuzmeyvədir. Meyvələr əvvəlcə yaşıl, sonda isə şabalıdı rəngli olmaqla oktyabr-noyabr aylarında yetişir. Yetişdikdə buynuzmeyvələri açılır və çoxlu sayda tüklü toxumlar ətrafa yayılır. Tədqiqat illərində bitkidə özözünə çoxalma müşahidə olunmamışdır. Hər hansı dayaqda birillik zoğların dolanması vasitəsilə dik dura bilir. Ümumiyyətlə, bitkidə sürünmək və sallanmaq xüsusiyyəti daha yüksəkdir.

## MATERIALVƏ METODLAR

Tədqiqat materialı olaraq 2012-ci ildə əldə olunmuş 20 (iyirmi) ədəd oduncaqlaşmış və 20 (iyirmi) ədəd yaşıl qələmlərdən istifadə edilmişdir. Qələmlər İtaliyadan gətirilmiş bitki üzərindən götürülmüşdür.

Çoxaldılmada R.X.Turetskayanın, F.V.Polikarpovanın, T.V.Xromovanın və F.M.Məmmədovun metodlarından istifadə edilmişdir (Məmmədov, 1998; Турецкая и Поликарпова, 1968; Хромова, 1980). Əsas zoğların böyümə dinamikası A.A.Molçanovun B.V.Smirnovun təklif etdikləri metodika əsasında öyrənilmişdir (Молчанов и Смирнов, 1967).

## NƏTICƏLƏR VƏ ONLARIN MÜZAKIRƏSI

Qeyd olunmalıdır ki, qələmlərin tədarükü və əkini zamanı qəbul olunmuş ümumi metodikalara riayət olunmaqla aşağıdakı tədbirlərə də ciddi əməl olunmuşdur:

- Qələmlər sağlam bitkidən və bitkinin orta yarusudan götürülmüş və kökverməyə təsir edən boy maddəsi olan indolil yağ turşusundan istifadə edilməmişdir;
- Qələmlər aşağıdakı tərkibdə və nisbətdə hazırlanmış substrata əkilmişdir: meşə torpağı, yanmış peyin, şirəli qum – (1:0,5:2);
- Qələmlər 1%-li kalium-permanqanat məhlulunda 30 dəqiqə saxlanılmışdır;
- Əkin zamanı qələmlərdə bir buğum və iki yarpaq substratın səthində, qalan hissəsi isə substratın içində saxlanılmışdır.

Qələmlərlə çoxaldılmada tətbiq olunan əməliyyatlar və çoxaldılmanın gedişi 1 saylı cədvəldə verilir.

***Cədvəl 1.*** Abşeron şəraitində (M.N.B.) *Jasminvari traxelospermum* növünün oduncaqlaşmış qələmlərlə çoxaldılması

| İllər | Qələmlərin xüsusiyyətləri | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Uzunluğu (5 m) | Diametri (5 m) | tumurcuq-ların sayı | yarpaqların sayı (ədəd) | ana bitkidən götürülmə tarixi | əkilmə tarixi | əkilmə dərinliyi (5 m) | qələmlərin sayı (ədəd) | tumurcuqların böyümə tarixi | bitmiş qələmlərin sayı (ədəd) | Bitmə faizi (%) |
| 2012 | 18-20 | 0.5 | 8-10 | 1-2 | 10.04 | 11.04 | 15-18 | 20 | 05.05 | 8 | 40 |
| 2013 | – | – | – | – | – | – | – | – | – | 7 | 35 |
| 2014 kölgələndirilmişdir | – | – | – | – | – | – | – | – | – | 12 | 60 |

***Cədvəl 2.*** *Jasminvari traxelospermum* növünün vegetasiya dövrü əsas zoğunun böyümə dinamikası (sm-lə)

| s/s | Ölçmələrin aparıldığı tarix | Kölgədə | | Günəşli yerdə | | Yarımkölgədə | |
|---|---|---|---|---|---|---|---|
| | | artım | ümumi | artım | ümumi | artım | ümumi |
| 1 | 30.05.2014 | 15,0±2,0 | 15,0±2,0 | 20,0±2,0 | 20,0±2,0 | 18,0±2,0 | 18,0±2,0 |
| 2 | 30.06.2014 | 18,0±3,0 | 33,0±3,0 | 20,0±2,0 | 40,0±2,0 | 25,0±3,0 | 43,0±2,0 |
| 3 | 30.07.2014 | 12,0±2,0 | 45,0±2,0 | 15,0±1,0 | 55,0±1,0 | 30,0±3,0 | 73,0±3,0 |
| 4 | 30.08.2014 | 12,0±2,0 | 57,0±2,0 | 7,0±2,0 | 62,0±2,0 | 27,0±2,0 | 100,0±2,0 |
| 5 | 30.09.2014 | 15,0±3,0 | 72,0±3,0 | 13,0±3,0 | 75,0±3,0 | 28,0±3,0 | 128,0±3,0 |
| 6 | 30.10.2014 | 7,0±1,0 | 79,0±1,0 | 12,0±2,0 | 87,0±2,0 | 20,0±2,0 | 148,0±2,0 |
| 7 | 30.11.2014 | 5,0±2,0 | 84,0±2,0 | 60,0±3,0 | 93,0±2,0 | 10,0±2,0 | 158,0±2,0 |
| 8 | 30.12.2014 | --- | 84,0±2,0 | --- | 93,0±2,0 | --- | 158,0±2,0 |



**Şəkil.** *Trachelospermum jasminoides*

Cədvəl 1-dən göründüyü kimi, qələmlərin bütün göstəricilərinin və tətbiq olunan aqrotexniki tədbirlərin eyni olmasına baxmayaraq, onlarda bitiş faizi 2012-ci ildə 40%, 2013-cü ildə 35%, 2014-cü ildə isə 60% olmuşdur. Biz, 2014-cü ildə qələmlərin bitiş faizinin yüksək olmasını, onların süni şəkildə kölgələndirilməsi ilə əlaqələndiririk. Abşeronun yay aylarında qızmar günəş şüaları bitkinin cavan fərdlərinin inkişafına mənfi təsir göstərir. Günəş amilinin yaşlı bitkilərin də normal inkişafına mənfi təsir göstərdiyi tərəfimizdən müşahidə edilmişdir. Buradan belə bir nəticəyə gəlmək olur ki, Jasminvari traxelospermum yarımkölgə şəraitdə daha yaxşı inkişaf edir. Cədvəl 2-nin nəticələri fikrimizi bir daha təsdiq etməyə əsas verir.

Tədqiqat işləri üçillik bitkilərdən seçilmiş, hər bir şəraitdə üç ədəd bitki olmaqla, cəmi 9 (doqquz) bitki üzərində aparılmışdır. Ölçmələr hər ayın sonunda yerinə yetirilmişdir.

Tədqiqatlar nəticəsində məlum olmuşdur ki, Abşeron şəraitində Jasminvari traxelospermum yarımkölgə şəraitdə çox yaxşı inkişaf edir. Belə ki, il ərzində əsas zoğun uzunluğu kölgədə 84 sm, günəşli yerdə 93 sm olduğu halda, yarımkölgə şəraitində 158 sm olmuşdur. Bu hal bitkinin çoxaldılması zamanı da müşahidə edilmişdir. Cədvəl 1-dən aydın olur ki, 2014-cü ildə kölgələndirilmiş şəraitdə qələmlərin bitmə faizi digər illərə nisbətən daha yüksək olmuşdur. Buradan da belə nəticəyə gəlmək olur ki, bitkinin sürətli çoxaldəlmasında qələmlərin əsasən süni kölgələndirilməsi üsulundan istifadə olunmalıdır. Çoxaldılmada diqqəti çəkən məqamlardan biri də o olmuşdur ki, vegetativ üsulla digər çətin çoxalan bitkilərdən fərqli olaraq Jasminvari traxelospermum növündə oduncaqlaşmış qələmlərlə çoxaldılma asan olduğundan inkişafı, xüsusilə kök əmələgəlməni intensivləşdirmək üçün xüsusi boy maddələrindən (auksinlər, hibberellinlər və s.) istifadə olunması zəruri deyil. Bu isə çoxaldılmanın iqtisadi cəhətdən səmərəsini artırır.

Tədqiqatlar nəticəsində müəyyən olunmuş xüsusiyyətlər landaşf dizaynı tədbirlərində bitkinin yerinin düzgün seçilməsində və ondan geniş istifadə olunmasında mühüm rol oynayır.

## ƏDƏBİYYAT

**Məmmədov F.M.** (1998) Bitkinin vegetativ çoxaldılması. Bakı, 210 s.

**Молчанов А.А., Смирнов Б.В.** (1967) Методики изучения прироста древесных растений. М.: Наука, 99 с.

**Турецкая Р.Х., Поликарпова Ф.Я.** (1968) Вегетативное размножение растений с применением стимулятора роста. М.: Наука, 94 с.

**Хромова Т.В.** (1980) Методические указания по размножению интродуцированных древесных растений черенками. М., 45 с.

## Изучение Вегетативного Размножения И Биоэкологические Особенности Видов *Trachelospermum jasminoides* L. В Условиях Абшерона

**А.Д. Мехралыев**

*Центральный ботанический сад НАНА*

Статья посвящена изучению биоэкологических особенностей, интродукции и вегетативному размножению вида *Trachelospermum jasminoides* L. На Абшероне (Центральный Ботанический Сад). Впервые было выявлено, что этот вид проходит нормальное развитие и может быть рекомендован в вертикальном озеленении Абшерона.

***Ключевые слова:*** *Вегетативное размножение, черенки, полутень, интенсивность роста*

## The Study Of Vegetative Propagation And The Bioecological Features Of Species *Trachelospermum jasminoides* Under Absheron Conditions

**A.D. Mehralıyev**

*Central Botanical Garden, ANAS*

The study is devoted to the research of bioecological features, introduction and the vegetative reproduction of species *Trachelospermum jasminoides* L. in Absheron (Central Botanical Garden). For the first time it has been revealed that this species develops normally and can be recommended for the vertical greening of Absheron.

***Key words:*** *Vegetative reproduction, cuttings, penumbra, the development intensity*